## *Mərhəmətli, Rəhmli Allahın adı ilə!*

# *MÜQƏDDİMƏ*

Həqiqətən, şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edir, Onu köməyə çağırır, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyir, nəfsimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə, o, doğru yolda olar, kimi azdırarsa, onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”**[1]

**“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın** ***törədib yer üzünə*** **yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən** ***cür-bəcür şeylər*** **istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir”.**[2]

---

[1] Ali-İmran, 102.
[2] ən-Nisa, 1.

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, sizin əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar".**[1]

Sonra isə məlumunuz olsun ki, Allahın adlarının və sifətlərinin doğruluğuna inanmaq Uca Allaha iman gətirməyin əsaslarından biridir. Allahın adını vasitə edib dua etmək ibadətdir: "Ən gözəl adlar Allahındır. Ona bu adlar vasitəsi ilə dua edin və Onun adları barəsində haqdan sapanları tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar."[2]

## Allahın Qurani Kərimdə çəkilən adları.

1. Allah (əl-Bəqərə, 255);
2. əl-Əhəd (əl-İxlas, 1);
3. əl-Ə'la (əl-Ə'la, 1);
4. əl-Əkram (əl-Ə'ləq, 3);
5. əl-İləh (əl-Bəqərə, 163);
6. əl-Əvvəl (əl-Hədid, 3);
7. əl-Axir (əl-Hədid, 3);
8. əz-Zahir (əl-Hədid, 3);
9. əl-Batin (əl-Hədid, 3);
10. əl-Bari' (əl-Həşr, 24);

[1] əl-Əhzab, 70-71.
[2] əl-Əraf, 180.

11. əl-Bərr (ət-Tur, 28);
12. əl-Bəsir (əş-Şura, 11);
13. ət-Təvvab (əl-Bəqərə, 163);
14. əl-Cəbbar (əl-Həşr, 24);
15. əl-Hafiz (Yusif, 64);
16. əl-Həfiz (Hud, 57);
17. əl-Həsib (ən-Nisa, 6);
18. əl-Həfi (Məryəm, 47);
19. əl-Həqq (ən-Nur, 25);
20. əl-Mubin (ən-Nur, 25);
21. əl-Həkim (əl-Bəqərə, 163);
22. əl-Həlim (əl-Maidə, 101);
23. əl-Həmid (əl-Bəqərə, 267);
24. əl-Heyy (əl-Bəqərə, 255);
25. əl-Qəyyum (əl-Bəqərə, 255);
26. əl-Xəbir (ət-Təhrim, 3);
27. əl-Xaliq (əl-Həşr, 24);
28. əl-Xalləq (əl-Hicr, 86);
29. ər-Rauf (ət-Tövbə, 117);
30. ər-Rəhman (əl-Bəqərə, 163);
31. ər-Rəhim (əl-Bəqərə, 163);
32. ər-Rəzzaq (əz-Zariyat, 58)
33. ər-Rəqib (ən-Nisa, 1);
34. əs-Səlam (əl-Həşr, 23);
35. əs-Səmi' (əş-Şura, 23);
36. əş-Şakir (əl-Bəqərə, 158);
37. əş-Şəkur (əş-Şura, 23);
38. əş-Şəhid (Ali İmran, 98);

39. əs-Səməd (əl-İxlas, 2);
40. əl-Əlim (əl-Bəqərə, 32);
41. əl-Aziz (əl-Həşr, 23);
42. əl-Azim (əl-Bəqərə, 255);
43. əl-Afuv (əl-Həcc, 60);
44. əl-Alim (əl-Ən'am, 73);
45. əl-Ali (əl-Bəqərə, 255);
46. əl-Ğəffar (Ta ha, 82);
47. əl-Ğəfur (əl-Maidə, 101);
48. əl-Ğəni (əl-Bəqərə, 267);
49. əl-Fəttah (Səba, 26);
50. əl-Qadir (əl-Ən'am, 65);
51. əl-Qahir (əl-Ən'am, 18);
52. əl- Quddus (əl-Həşr, 23);
53. əl-Qədir (əl-Bəqərə, 20);
54. əl-Qərib (əl-Bəqərə, 186);
55. əl-Qəviy (əl-Ənfal, 52);
56. əl-Qəhhar (Yusif, 39);
57. əl-Kəbir (əl-Həcc, 60);
58. əl-Kərim (əl-İnfitar, 6);
59. əl-Lətif (əl-Ənam, 103);
60. əl-Mumin (əl-Həşr, 23);
61. əl-Mutəali (R'ad, 9);
62. əl-Mutəkəbbir (əl-Həşr, 23);
63. əl-Mətin (əz-Zariyat, 58);
64. əl-Mucib (Hud, 61);
65. əl-Məcid (Hud, 73);
66. əl-Muhit (Fussilət, 54);

67. əl-Musavvir (əl-Həşr, 24);
68. əl-Muqtədir (əl-Qəmər, 55);
69. əl-Muqit (ən-Nisa, 85);
70. əl-Malik (əl-Fatihə, 4);
71. əl-Məliik (əl-Qamər, 55);
72. əl-Mövla (əl-Ənfal, 40);
73. əl-Muheymin (əl-Həşr, 23);
74. ən-Nasir (əl-Ənfal, 40);
75. əl-Vahid (əl-Bəqərə, 163);
76. əl-Varis (əl-Hicr, 23);
77. əl-Vasi (əl-Bəqərə, 115);
78. əl-Vədud (əl-Büruc, 14);
79. əl-Vəkil (Ali İmran, 173);
80. əl-Vəli (əl-Bəqərə, 257);
81. əl-Vəhhab (Ali İmran, 8);

**Allahın hədislərdə varid olan adları.**

82. əl-Cəmil (Muslim, 147-ci hədis);
83. əl-Cəvvad (Sahihul-cami, 1796-cı hədis);
84. əl-Həkəm (Əbu Davud, 4955-ci hədis);
85. əl-Həyiy (Əbu Davud, 1488-ci hədis);
86. ər-Rəbb (ət- tirmizi, 3579-cu hədis);
87. ər-Rəfiq (Muslim, 2593-cü hədis);
88. əs-Subbuh (Muslim, 487-ci hədis);
89. əs-Seyyid (Əbu Davud, 4806-cı hədis);
90. əş-Şafi (Muslim, 2191-ci hədis);
91. ət-Tayyib (Muslim, 1015-ci hədis);
92. əl-Qabid (Əbu Davud, 3451-ci hədis);

93. əl-Basit (Əbu Davud, 3451-ci hədis);
94. əl-Muqəddim (Muslim, 771-ci hədis);
95. əl-Muəxxir (Muslim, 771-ci hədis);
96. əl-Muhsin (səhih hədislər silsiləsi, 469);
97. əl-Mu'ti (əl-Buxari, 3116-cı hədis);
98. əl-Mənnan (Əbu Davud, 1495-ci hədis);
99. əl-Vitr (əl-Buxari, 6410-cu hədis);

Uca Allahın adları müəyyən bir ədədlə məhdudlaşmır. Bunu Peyğəmbərin ﷺ bu duası ilə əsaslandırmaq olar. Peyğəmbər ﷺ Uca Rəbbinə bu cür dua etmişdir: "Allahım! Mən Sənin qulunam, qulunun oğluyam, kənizinin oğluyam! Kəkilim (məni idarə etmək) Sənin əlindədir. Barəmdə verdiyin hökm yerinə yetəndir. Mənə yazdığın tale ədalətlidir. Sənə, Özünə verdiyin və ya Kitabında nazil etdiyin yaxud yaratdıqlarından kiməsə öyrətdiyin yaxud da Öz yanında olan qeyb elmində saxladığın Özünə aid olan hər bir adla yalvarıram ki, Quranı qəlbimin baharı və köksümün nuru et, üzüntümün aradan qalxması və kədərimin getməsi (üçün səbəb) et!"[1] Uca Allaha aid olan adları isə heç kəsin məhdudlaşdırılması, və ya əhatə etməsi mümkün deyil. Peyğəmbərin ﷺ ***"Allahın doxsan doqquz – yüzdən bir əskik adı var, kim onları sadalasa Cənnətə daxil olar"*** – kəlamına gəldikdə isə bu heç də Allahın adlarının bu ədədlə məhdud-

[1] Əhməd, 1/391. Albani bu hədisi "səhih" hesab etmişdir.

laşdığına dəlalət etmir. Əgər burada məqsəd onların sayını məhdudlaşdırmaq olsaydı, Peyğəmbər ﷺ öz hədisini bu cür ifadə edərdi: "Allahın adlarının sayı doxsan doqquzdur, kim onları sadalasa Cənnətə daxil olar" və yaxud buna oxşar bir şəkildə ifadə edərdi. Deməli, hədisdən belə məna çıxır ki, bu elə bir ədəddir ki, kim Allahın adlarını bu sayda çəksə, Cənnətə daxil olar. Buna əsaslanaraq demək olar ki, Peyğəmbərin ﷺ işlətdiyi "...kim Allahın adlarından bu sayda sadalasa, Cənnətə daxil olar." cümləsi müstəqil cümlə olmayıb, özündən əvvəlki cümləni tamamlayan bir cümlədir. Əslində, bu sözü yalnız "...kim Allahın adlarından bu sayda sadalasa..." mübtəda budaq cümləsinə aid etmək lazımdır. Bu ona bənzəyir ki, deyəsən: "Məndə sədəqə üçün ayırdığım yüz dirhəm pul var." Bu o demək deyil ki, səndə sədəqə üçün ayırmadığın başqa pullar ola bilməz. Bu adların dəqiq sayı haqqında Peyğəmbərdən ﷺ bizə heç bir hədis gəlib çıxmayıb. Bu haqda rəvayət olunmuş hədis də zəif hədisdir. Həmin hədisi Tirmizi rəvayət etmişdir.

## Duanın fəziləti.

Qurani Kərimdə Uca Allah buyurur: "Rəbbiniz dedi: "Mənə dua edin, Mən də sizə cavab verim. Həqiqətən, Mənə ibadət etməyə təkəbbür göstərənlər Cəhənnəmə zəlil olaraq girəcəklər".[1]

---

[1] Ğafir, 60.

“Qullarım səndən Mənim barəmdə soruşsalar, Mən *onlara* yaxınam, Mənə yalvaranın duasını yalvardığı vaxt qəbul edərəm. Qoy onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər ki, doğru yola yönələ bilsinlər.”[1]

Nomən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Dua ibadətdir.”[2]

Salman Farisi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizin Rəbbiniz həyalıdır və kərəm Sahibidir, əllərini Ona tərəf qaldırıb dua edən qulunun əllərini boş qaytarmağa utanır."[3]

**Duanın ədəbləri və qəbul olunmasının səbəbləri.**

1. İxlas ilə Allah üçün dua etmək;
2. Duanı Allaha həmd edib Peyğəmbərə ﷺ salavat gətirməklə başlamaq və bitirmək;
3. Duanın qəbul olunmasına ümid etmək:
4. Dua etdikdə tələsməmək;
5. Dua zamanı fikri yayındırmamaq:
6. Çətinlikdə də, firavanlıqda da dua etmək;
7. Yalnız tək Allahdan istəmək;
8. Alçaq səslə dua etmək;
9. Günahı etiraf etmək və onun bağışlanmasını diləmək, neməti etiraf etmək və ona görə Allaha şükür etmək;

---

[1] əl-Bəqərə, 186.
[2] Səhih hədislər silsiləsi, 6/326.
[3] Əbu Davud, 1485-ci hədis.

10. Rəğbət və qorxu ilə dua etmək;
11. Duanı üç dəfə təkrar etmək;
12. Qibləyə tərəf yönəlmək;
13. Əlləri qaldırmaq;
14. Dəstəmazlı olmaq (mümkündürsə);
15. Dua edənin yediyi, içdiyi və geydiyi halal olmalıdır;
16. Qohumluq əlaqələrini kəsmək və ya hər hansı bir günah etmək üçün dua etməmək ;
17. Günahlardan uzaq olmaq.

## Duanın qəbul olan vaxtları və yerləri.

1. Qədr gecəsi;
2. Gecənin axır üçdə biri;
3. Fərz namazlarından sonra;
4. Azan ilə iqamə arasında;
5. Yağış yağdığı zaman;
6. Cümə günü;
7. Zəm-zəm suyunu içdikdə;
8. Səcdəyə qapıldıqda;
9. Təşəhhüddən sonra və salamdan əvvəl;
10. Ərəfat günü;
11. Elm məclisində;
12. Müsibət gəldikdə;
13. Zülmə məruz qaldıqda;
14. Səfərdə olduqda;
15. Valideynin övladı və övladın valideyni üçün etdiyi dua;

16. İftara qədər;
17. İftar zamanı;
18. Ehtiyac üzündən;
19. Ədalətli imamın duası;
20. Kəbənin içərisində;
21. Səfa və Mərva təpələrinin üstündə;
22. Kiçik cəmərəyə daş atdıqdan sonra;
23. Orta cəmərəyə daş atdıqdan sonra.

Ey möminlər, Rəbbinizi unutmayın! Həqiqi möminlər hər zaman özlərinin Rəbbini yad edərlər. Uca Allah buyurur: “O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı yad edir, göylərin və yerin yaradılması haqqında düşünür *və deyirlər:* “Ey Rəbbimiz! Sən bunları əbəs yerə xəlq etməmisən. Sən pak və müqəddəssən. Bizi Odun əzabından qoru!”[1]

## Qurani-Kərimdən seçilmiş dualar.

﴿ رَبَّنَا ظَلَمْنَآ أَنفُسَنَا وَإِن لَّمْ تَغْفِرْ لَنَا وَتَرْحَمْنَا لَنَكُونَنَّ مِنَ ٱلْخَٰسِرِينَ ﴾

[Rabbənə zaləmnə ənfusənə və in ləm təğfir lənə və tərhəmnə lənəkunənnə minəlxasirin.]

“Ey Rəbbimiz! Biz özümüzə zülm etdik. Əgər bizi bağışlamasan və bizə rəhm etməsən, əlbəttə, ziyana uğrayanlardan olarıq.”[2]

---

[1] Ali-İmran, 191.
[2] əl-Əraf, 23.

﴿ رَبِّ إِنِّيٓ أَعُوذُ بِكَ أَنۡ أَسۡـَٔلَكَ مَا لَيۡسَ لِي بِهِۦ عِلۡمٞۖ وَإِلَّا تَغۡفِرۡ لِي وَتَرۡحَمۡنِيٓ أَكُن مِّنَ ٱلۡخَٰسِرِينَ ﴾

[Rabbi inni əuzu bikə ən əsələkə mə leysə li bihi elmun və illə təğfir li və tərhəmni əkun minəl-xasirin.]

"Ey Rəbbim! Bilmədiyim bir şeyi Səndən istəməkdən Sənə sığınıram. Əgər məni bağışlamasan, mənə rəhm etməsən, ziyana uğrayanlardan olaram."[1]

﴿ رَّبِّ ٱغۡفِرۡ لِي وَلِوَٰلِدَيَّ وَلِمَن دَخَلَ بَيۡتِيَ مُؤۡمِنٗا وَلِلۡمُؤۡمِنِينَ وَٱلۡمُؤۡمِنَٰتِۖ وَلَا تَزِدِ ٱلظَّٰلِمِينَ إِلَّا تَبَارَۢا ﴾

[Rabbi-ğfirli və livalideyyə və limən dəxalə beytiyə muminən və lilmumininə vəlmuminət və lə təzidiz-zaliminə illə təbara.]

"Ey Rəbbim! Məni, valideynlərimi, evimə mömin kimi daxil olanları və *bütün* mömin kişi və qadınları bağışla! Zülmkarların isə ancaq həlakını artır."[2]

﴿ رَبَّنَا تَقَبَّلۡ مِنَّآۖ إِنَّكَ أَنتَ ٱلسَّمِيعُ ٱلۡعَلِيمُ ﴾

[Rabbənə təqabbəl minnə, innəkə əntəs-səmiyul-alim.]

"Ey Rəbbimiz! *Bunu* bizdən qəbul et! Həqiqətən, Sən Eşidənsən, Bilənsən!"[3]

---

[1] Hud, 47.
[2] Nuh, 28.
[3] əl-Bəqərə , 127.

﴿وَتُبۡ عَلَيۡنَآۖ إِنَّكَ أَنتَ ٱلتَّوَّابُ ٱلرَّحِيمُ﴾

[Və tub aleynə, innəkə əntə-t-təvvabu-r-rahim.]

“Bizim tövbələrimizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edənsən, Rəhmlisən!”[1]

﴿رَبِّ ٱجۡعَلۡنِي مُقِيمَ ٱلصَّلَوٰةِ وَمِن ذُرِّيَّتِيۚ رَبَّنَا وَتَقَبَّلۡ دُعَآءِ﴾

[Rabbi-c-alni muqiymə-s-saləti və min zurriyyəti. Rabbənə və təqabbəl duai.]

“Ey Rəbbim! Məni də, nəslimdən olanları da namaz qılan et! Ey Rəbbimiz! Duamı qəbul elə!”[2]

﴿رَبَّنَا ٱغۡفِرۡ لِي وَلِوَٰلِدَيَّ وَلِلۡمُؤۡمِنِينَ يَوۡمَ يَقُومُ ٱلۡحِسَابُ﴾

[Rabbənə-ğ-firli və livalideyyə və lil-mumininə yəumə yəqumul-hisəb.]

“Ey Rəbbimiz! Haqq-hesab günü məni, valideynlərimi və möminləri bağışla!”[3]

﴿رَبِّ هَبۡ لِي حُكۡمٗا وَأَلۡحِقۡنِي بِٱلصَّٰلِحِينَ ٨٣ وَٱجۡعَل لِّي لِسَانَ صِدۡقٖ فِي ٱلۡأٓخِرِينَ ٨٤
وَٱجۡعَلۡنِي مِن وَرَثَةِ جَنَّةِ ٱلنَّعِيمِ ٨٥﴾

[Rabbi həb li hukmən və əlhiqni bis-salihin vəcal li lisənə sidqin filaxirin vəc-alni min varəsəti cənnətin-nəim.]

“Ey Rəbbim! Mənə hikmət ver və məni əməlisalehlərə qovuşdur! Sonra gələnlər arasında *həmişə*

---

[1] əl-Bəqərə, 128.
[2] İbrahim, 40.
[3] İbrahim, 41.

*yad edilim deyə* mənə yaxşı ad qismət elə! Məni Nəim bağının varislərindən et!”[1]

﴿ رَبِّ هَبۡ لِي مِنَ ٱلصَّٰلِحِينَ ﴾

[Rabbi həb li minəs-salihin.]

“Ey Rəbbim! Mənə əməlisalehlərdən olan *övlad* bəxş et!”[2]

﴿ رَّبَّنَا عَلَيۡكَ تَوَكَّلۡنَا وَإِلَيۡكَ أَنَبۡنَا وَإِلَيۡكَ ٱلۡمَصِيرُ ﴾

[Rabbənə aleykə təvəkkəlnə və ileykə ənəbnə va ileykəl-masir.]

“Ey Rəbbimiz! Biz yalnız Sənə təvəkkül edir və yalnız Sənə üz tuturuq. Dönüş də yalnız Sənədir.”[3]

﴿ رَبَّنَا لَا تَجۡعَلۡنَا فِتۡنَةٗ لِّلَّذِينَ كَفَرُواْ وَٱغۡفِرۡ لَنَا رَبَّنَآۖ إِنَّكَ أَنتَ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ﴾

[Rabbənə lə təc'alnə fitnətən lil-ləzinə kəfəru vəğfir lənə rabbənə. İnnəkə əntəl-azizul-həkim.]

“Ey Rəbbimiz! Bizi kafirlər üçün sınaq etmə. Ey Rəbbimiz, bizi bağışla. Həqiqətən, Sən Qüdrətlisən, Müdriksən!”[4]

﴿ رَبِّ أَوۡزِعۡنِيٓ أَنۡ أَشۡكُرَ نِعۡمَتَكَ ٱلَّتِيٓ أَنۡعَمۡتَ عَلَيَّ وَعَلَىٰ وَٰلِدَيَّ وَأَنۡ أَعۡمَلَ صَٰلِحٗا تَرۡضَىٰهُ
وَأَدۡخِلۡنِي بِرَحۡمَتِكَ فِي عِبَادِكَ ٱلصَّٰلِحِينَ ﴾

[1] əş-Şuəra, 83-85.
[2] əs-Saffat, 100.
[3] əl-Mumtəhinə, 4.
[4] əl-Mumtəhinə, 5.

[Rabbi əvzini ən əşkura nimətəkəl-ləti ənamtə aleyyə və alə valideyyə və ən əmələ salihən tərdah və ədxilni birahmətikə fi ibadikəs-salihin.]

"Ey Rəbbim! Mənə həm mənim özümə, həm də valideynlərimə əta etdiyin nemətə şükür etmək üçün, Sənin razı qalacağın yaxşı əməli etmək üçün ilham ver və məni Öz mərhəmətinlə əməlisaleh qullarına qovuşdur!"[1]

﴿رَبِّ هَبۡ لِي مِن لَّدُنكَ ذُرِّيَّةٗ طَيِّبَةًۖ إِنَّكَ سَمِيعُ ٱلدُّعَآءِ﴾

[Rabbi həb li min lədunkə zurriyyətən tayyibə, innəkə səmiud-dua.]

"Ey Rəbbim! Öz tərəfindən mənə pak bir nəsil bəxş et! Şübhəsiz ki, Sən duaları Eşidənsən"[2]

﴿رَبِّ لَا تَذَرۡنِي فَرۡدٗا وَأَنتَ خَيۡرُ ٱلۡوَٰرِثِينَ﴾

[Rabbi lə təzərni fərdən və əntə xayrul-varisin.]

"Ey Rəbbim! Məni tənha buraxma. Sən varislərin ən yaxşısısan!"[3]

﴿لَّآ إِلَٰهَ إِلَّآ أَنتَ سُبۡحَٰنَكَ إِنِّي كُنتُ مِنَ ٱلظَّٰلِمِينَ﴾

[Lə iləhə illə əntə subhanəkə inni kuntu minəz-zalimin.]

"Səndən başqa *ibadətə layiq olan* heç bir məbud yoxdur! Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam!"[4]

---

[1] ən-Nəml, 19.
[2] Ali-İmran, 38.
[3] əl-Ənbiya, 89.
[4] əl-Ənbiya, 87.

﴿رَبِّ ٱشۡرَحۡ لِي صَدۡرِي ٢٥ وَيَسِّرۡ لِيٓ أَمۡرِي ٢٦ وَٱحۡلُلۡ عُقۡدَةٗ مِّن لِّسَانِي ٢٧ يَفۡقَهُواْ قَوۡلِي ٢٨﴾

[Rabbi-ş-rah li sadri və yəssir li əmri vəh-lul uqdətən min lisəni yəfqahu qauli.]

"Ey Rəbbim! Köksümü açıb genişlət! İşimi yüngülləşdir! Dilimdəki düyünü aç ki, sözümü anlasınlar!"[1]

﴿رَبِّ إِنِّي ظَلَمۡتُ نَفۡسِي فَٱغۡفِرۡ لِي﴾

[Rabbi inni zaləmtu nəfsi fəğfir li.]

"Ey Rəbbim! Mən özüm-özümə zülm etdim. Məni bağışla!"[2]

﴿رَبَّنَآ ءَامَنَّا بِمَآ أَنزَلۡتَ وَٱتَّبَعۡنَا ٱلرَّسُولَ فَٱكۡتُبۡنَا مَعَ ٱلشَّٰهِدِينَ﴾

[Rabbənə amənnə bimə ənzəltə vət-təbənər-rasulə fəktubnə məaşş-şahidin.]

"Ey Rəbbimiz! Biz sənin nazil etdiyinə iman gətirdik və *göndərdiyin* elçinin ardınca getdik. Bizi də şahidlərlə bir yerdə yaz!"[3]

﴿رَبَّنَا لَا تَجۡعَلۡنَا فِتۡنَةٗ لِّلۡقَوۡمِ ٱلظَّٰلِمِينَ ٨٥ وَنَجِّنَا بِرَحۡمَتِكَ مِنَ ٱلۡقَوۡمِ ٱلۡكَٰفِرِينَ﴾

[Rabbənə lə təc'alnə fitnətən lilqaumiz-zalimin və nəccinə birahmətikə minəl-qaumil-kafirin.]

"Ey Rəbbimiz! Bizi zalım qövmün əlində sınağa çəkmə! Və bizi Öz mərhəmətinlə kafir qövmün əlindən qurtar!"[4]

---

[1] Ta ha, 25-28.
[2] əl-Qasəs, 16.
[3] Ali-İmran, 53.
[4] Yunus, 85-86.

﴿رَبَّنَا ٱغۡفِرۡ لَنَا ذُنُوبَنَا وَإِسۡرَافَنَا فِيٓ أَمۡرِنَا وَثَبِّتۡ أَقۡدَامَنَا وَٱنصُرۡنَا عَلَى ٱلۡقَوۡمِ ٱلۡكَٰفِرِينَ﴾

[Rabbənə-ğfir lənə zunubənə və israfənə fi əmrinə və səbbit əqdamənə vənsurnə aləl-qaumil-kəfirin.]

"Ey Rəbbimiz! Günahlarımızı və əməllərimizdə həddi aşmağımızı bizə bağışla; qədəmlərimizi sabit et və kafir qövmə qələbə çalmaqda bizə yardım et!"[1]

﴿رَبَّنَآ ءَاتِنَا مِن لَّدُنكَ رَحۡمَةً وَهَيِّئۡ لَنَا مِنۡ أَمۡرِنَا رَشَدٗا﴾

[Rabbənə atinə min lədunkə rahmətən və həyyi lənə min əmrinə raşədə.]

"Ey Rəbbimiz! Bizə Öz tərəfindən mərhəmət bəxş et və işimizdə bizə düz yol göstər!"[2]

﴿رَّبِّ زِدۡنِي عِلۡمٗا﴾

[Rabbi zidni ilmən.]

"Ey Rəbbim! Elmimi artır!"[3]

﴿رَّبِّ أَعُوذُ بِكَ مِنۡ هَمَزَٰتِ ٱلشَّيَٰطِينِ ﴿٩٧﴾ وَأَعُوذُ بِكَ رَبِّ أَن يَحۡضُرُونِ ﴿٩٨﴾﴾

[Rabbi əuzu bikə min həməzatiş-şəyatin və əuzu bikə rabbi ən yəhdurun.]

"Ey Rəbbim! Şeytanların vəsvəsələrindən Sənə sığınıram! Onların mənə yaxınlaşmalarından Sənə sığınıram, ey Rəbbim!"[4]

---

[1] Ali-İmran, 147.
[2] əl-Kəhf, 10.
[3] Ta ha, 114.
[4] əl-Muminun, 97-98.

﴿رَّبِّ ٱغۡفِرۡ وَٱرۡحَمۡ وَأَنتَ خَيۡرُ ٱلرَّٰحِمِينَ﴾

[Rabbiğfir vərhəm və əntə xeyrur-rahimin.]

"Ey Rəbbim, bağışla və rəhm et! Sən rəhm edənlərin ən yaxşısısan!"[1]

﴿رَبَّنَآ ءَاتِنَا فِي ٱلدُّنۡيَا حَسَنَةٗ وَفِي ٱلۡأٓخِرَةِ حَسَنَةٗ وَقِنَا عَذَابَ ٱلنَّارِ﴾

[Rabbənə ətinə fid-dunyə həsənətən və fil axirəti həsənətən və qinə azəbən-nər.]

"Ey Rəbbimiz! Bizə həm *bu* dünyada, həm də axirətdə gözəl nemətlər ver və bizi Od əzabından qoru!"[2]

﴿سَمِعۡنَا وَأَطَعۡنَاۖ غُفۡرَانَكَ رَبَّنَا وَإِلَيۡكَ ٱلۡمَصِيرُ﴾

[Səminə və ətanə ğufranəkə rabbənə və ileykəlmasir.]

"Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"[3]

﴿رَبَّنَا لَا تُؤَاخِذۡنَآ إِن نَّسِينَآ أَوۡ أَخۡطَأۡنَاۚ رَبَّنَا وَلَا تَحۡمِلۡ عَلَيۡنَآ إِصۡرٗا كَمَا حَمَلۡتَهُۥ عَلَى ٱلَّذِينَ مِن قَبۡلِنَاۚ رَبَّنَا وَلَا تُحَمِّلۡنَا مَا لَا طَاقَةَ لَنَا بِهِۦۖ وَٱعۡفُ عَنَّا وَٱغۡفِرۡ لَنَا وَٱرۡحَمۡنَآۚ أَنتَ مَوۡلَىٰنَا فَٱنصُرۡنَا عَلَى ٱلۡقَوۡمِ ٱلۡكَٰفِرِينَ﴾

[Rabbənə lə tuəxiznə in nəsiynə əu əxtanə, rabbənə və lə təhmil aleynə isran kəmə haməltəhu alələzinə min qablinə, rabbənə və lə tuhəmmilnə mə

---

[1] əl-Muminun, 118.
[2] əl-Bəqərə, 201.
[3] əl-Bəqərə, 285.

lə taqətə lənə bihi, vafu annə vəğfir lənə vərhəm-nə, əntə məulənə fənsurnə aləl-qaumil-kəfirin.]

"Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi daşımağa bizi vadar etmə! Bizi əfv et, bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan! Kafirləri məğlub etməkdə bizə yardım et!"[1]

﴿ رَبَّنَا لَا تُزِغْ قُلُوبَنَا بَعْدَ إِذْ هَدَيْتَنَا وَهَبْ لَنَا مِن لَّدُنكَ رَحْمَةً ۚ إِنَّكَ أَنتَ ٱلْوَهَّابُ ﴾

[Rabbənə lə tuziğ qulubənə bədə iz hədəytənə və həb lənə min-lədunkə rahmətən innəkə əntəl-vəhhab.]

"Ey Rəbbimiz! Bizi hidayət yoluna yönəltdikdən sonra qəlbimizi sapdırma və bizə Öz tərəfindən mərhəmət bəxş et. Həqiqətən, Sən Bəxşedənsən."[2]

﴿ رَبَّنَا مَا خَلَقْتَ هَٰذَا بَٰطِلًا سُبْحَٰنَكَ فَقِنَا عَذَابَ ٱلنَّارِ ﴿١٩١﴾ رَبَّنَآ إِنَّكَ مَن تُدْخِلِ ٱلنَّارَ فَقَدْ
أَخْزَيْتَهُۥ ۖ وَمَا لِلظَّٰلِمِينَ مِنْ أَنصَارٍ ﴿١٩٢﴾ رَّبَّنَآ إِنَّنَا سَمِعْنَا مُنَادِيًا يُنَادِى لِلْإِيمَٰنِ أَنْ ءَامِنُوا۟
بِرَبِّكُمْ فَـَٔامَنَّا ۚ رَبَّنَا فَٱغْفِرْ لَنَا ذُنُوبَنَا وَكَفِّرْ عَنَّا سَيِّـَٔاتِنَا وَتَوَفَّنَا مَعَ ٱلْأَبْرَارِ ﴿١٩٣﴾ رَبَّنَا
وَءَاتِنَا مَا وَعَدتَّنَا عَلَىٰ رُسُلِكَ وَلَا تُخْزِنَا يَوْمَ ٱلْقِيَٰمَةِ ۗ إِنَّكَ لَا تُخْلِفُ ٱلْمِيعَادَ ﴿١٩٤﴾ ﴾

[Rabbənə mə xaləqtə həzə batilən subhanəkə fəqinə azəbən-nər. Rabbənə innəkə mən tudxilin-

---

[1] əl-Bəqərə, 286.
[2] Ali-İmran, 8.

nəra fəqad əxzəytəhu və ma liz-zaliminə min ənsar. Rabbənə innənə səminə munədiyən yunədi liliməni ən aminu birabbikum fə amənnə. Rabbənə fəğfir lənə zunubənə və kəffir annə seyyiainə və təvaffənə məal-əbrar. Rabbənə və atinə mə vəadtənə alə rusulikə və lə tuxzinə yəuməl-qiyaməti. İnnəkə lə tuxliful-miyad.]

"Ey Rəbbimiz! Sən bunları əbəs yerə xəlq etməmisən. Sən pak və müqəddəssən. Bizi Odun əzabından qoru! Ey Rəbbimiz! Sən Oda saldığın kəsi rüsvay edərsən. Zalımların köməkçiləri olmaz. Ey Rəbbimiz! Həqiqətən, biz: "Rəbbinizə iman gətirin!"– deyə imana çağıran bir kimsənin çağırışını eşidib iman gətirdik. Ey Rəbbimiz! Günahlarımızı bizə bağışla, təqsirlərimizdən keç və canımızı itaətkarlarla bir yerdə al! Ey Rəbbimiz! Öz elçilərinin vasitəsi ilə bizə vəd etdiklərini ver və Qiyamət günü bizi rüsvay etmə! Şübhəsiz ki, Sən vədindən dönməzsən!"[1]

﴿ رَبَّنَا ٱصْرِفْ عَنَّا عَذَابَ جَهَنَّمَ ۖ إِنَّ عَذَابَهَا كَانَ غَرَامًا ﴿٦٥﴾ إِنَّهَا سَآءَتْ مُسْتَقَرًّا وَمُقَامًا ﴿٦٦﴾ ﴾

[Rabbənəsrif annə əzabə cəhənnəmə innə əzabəhə kənə ğaramən innəhə səət mustəqarran və muqamə.]

---

[1] Ali-İmran, 191-194.

“Ey Rəbbimiz! Cəhənnəm əzabını bizdən uzaq elə. Doğrusu, onun əzabı həmişəlikdir. Həqiqətən, ora nə pis məskən, necə də pis iqamətgahdır!”[1]

﴿رَبَّنَا هَبۡ لَنَا مِنۡ أَزۡوَٰجِنَا وَذُرِّيَّٰتِنَا قُرَّةَ أَعۡيُنٖ وَٱجۡعَلۡنَا لِلۡمُتَّقِينَ إِمَامًا﴾

[Rabbənə həb lənə min əzvacinə və zurriyyətinə qurratə əayunin vəc-alnə lil-muttəqinə imamə.]

“Ey Rəbbimiz! Bizə gözümüzün aydınlığı olan zövcələr və övladlar bəxş et və bizi müttəqilərə imam et!”[2]

﴿رَبَّنَا ٱغۡفِرۡ لَنَا وَلِإِخۡوَٰنِنَا ٱلَّذِينَ سَبَقُونَا بِٱلۡإِيمَٰنِ وَلَا تَجۡعَلۡ فِي قُلُوبِنَا غِلّٗا لِّلَّذِينَ ءَامَنُواْ رَبَّنَآ إِنَّكَ رَءُوفٞ رَّحِيمٌ﴾

[Rabbənəğ-fir lənə və li ixvaninəl-ləzinə səbəqunə bilimən və lə təc'al fi qulubinə ğıllən lil-ləzinə amənu. Rabbənə innəkə raufur-rahim.]

“Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən də, Sən Şəfqətlisən, Rəhmlisən!”[3]

﴿رَبَّنَآ أَتۡمِمۡ لَنَا نُورَنَا وَٱغۡفِرۡ لَنَآۖ إِنَّكَ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٞ﴾

[Rabbənə ətmim lənə nuranə vəğfir lənə innəkə alə kulli şeyin qadir.]

---

[1] əl-Furqan, 65-66.
[2] əl-Furqan, 74.
[3] əl-Həşr, 10.

“Ey Rəbbimiz! Nurumuzu bizim üçün tamamla və bizi bağışla. Həqiqətən, Sən hər şeyə qadirsən!”[1]

﴿رَبِّ ٱجۡعَلۡ هَٰذَا ٱلۡبَلَدَ ءَامِنٗا وَٱجۡنُبۡنِي وَبَنِيَّ أَن نَّعۡبُدَ ٱلۡأَصۡنَامَ﴾

[Rabbic'al həzəl-bələdə əminən vəcnubni və bəniyyə ən nəbudəl-əsnam.]

“Ey Rəbbim! Bu şəhəri əmin-amanlıq *yurdu* et. Məni və oğullarımı bütlərə tapınmaqdan uzaqlaşdır.”[2]

﴿رَبِّ إِنِّي لِمَآ أَنزَلۡتَ إِلَيَّ مِنۡ خَيۡرٖ فَقِيرٞ﴾

[Rabbi inni limə ənzəltə ileyyə min xeyrin fəqir.]

“Ey Rəbbim! Sənin mənə nazil edəcəyin xeyrə ehtiyacım var!”[3]

﴿رَبِّ ٱنصُرۡنِي عَلَى ٱلۡقَوۡمِ ٱلۡمُفۡسِدِينَ﴾

[Rabbinsurni aləl-qaumil-mufsidin.]

“Ey Rəbbim! Fitnə-fəsad törədən qövmün əleyhinə mənə kömək et!”[4]

﴿حَسۡبِيَ ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَۖ عَلَيۡهِ تَوَكَّلۡتُۖ وَهُوَ رَبُّ ٱلۡعَرۡشِ ٱلۡعَظِيمِ﴾

[Həsbiyəllahu lə iləhə illə huva aleyhi təvəkkəltu və huva rabbul-arşil-azım.]

---

[1] ət-Təhrim, 8.
[2] İbrahim, 35.
[3] əl-Qəsəs, 24.
[4] əl-Ənkəbut, 30.

“Mənə Allah yetər. Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur. Mən Ona təvəkkül etdim. O, böyük Ərşin Rəbbidir!”[1]

﴿عَسَىٰ رَبِّيٓ أَن يَهۡدِيَنِي سَوَآءَ ٱلسَّبِيلِ﴾

[Asə rabbi ən yəhdiyəni səvaəs-səbil.]

“Ola bilsin ki, Rəbbim mənə doğru yolu göstərsin!”[2]

## Səhih hədislərdəki bəzi dualar.

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ فِتْنَةِ النَّارِ وَعَذَابِ النَّارِ وَفِتْنَةِ الْقَبْرِ وَعَذَابِ الْقَبْرِ وَشَرِّ فِتْنَةِ الْغِنَى وَشَرِّ فِتْنَةِ الْفَقْرِ اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ شَرِّ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ اللَّهُمَّ اغْسِلْ قَلْبِي بِمَاءِ الثَّلْجِ وَالْبَرَدِ وَنَقِّ قَلْبِي مِنْ الْخَطَايَا كَمَا نَقَّيْتَ الثَّوْبَ الأَبْيَضَ مِنْ الدَّنَسِ وَبَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ الْكَسَلِ وَالْمَأْثَمِ وَالْمَغْرَمِ ))

[Allahummə, inni əuzu bikə min fitnətin-nari və əzabin-nari və fitnətil qəbri və əzabil-qəbri və şərri fitnətil-ğina və şərri fitnətil-fəqri. Allahummə, inni əuzu bikə min şərri fitnətil-məsihid-dəccal. Allahumməğsil qalbi bimais-səlci vəl-bərədi və nəqqi qalbi minəl-xətaya kəmə nəqqaytəs-sovbəl-əbyədə minəd-dənəsi və baid beyni və beynə xətayaya kəmə baədtə beynəl-məşriqi vəl-məğribi. Allahummə, inni əuzu bikə minəl-kəsəli, vəl-məsəmi, vəl-məğrəmi.]

---

[1] ət-Tovbə, 129.
[2] əl-Qəsəs, 22.

“Allahım, Cəhənnəm fitnəsindən, Cəhənnəm əzabından, qəbir fitnəsindən, qəbir əzabından, var-dövlət fitnəsinin şərindən və yoxsulluğun fitnəsinin şərindən Sənə sığınıram. Allahım, Məsihid-dəccalın fitnəsinin şərindən Sənə sığınıram. Allahım, mənim qəlbimi qar və dolu suyu ilə yu, ağ paltarı kirdən təmizlədiyin kimi qəlbimi də günahlardan təmizlə, məğriblə məşriqin arasını uzaqlaşdırdığın kimi məni də günahlarımdan uzaqlaşdır. Allahım, tənbəllikdən, günahdan və borcdan Sənə sığınıram.”[1]

((اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ الْعَجْزِ وَالْكَسَلِ وَالْجُبْنِ وَالْبُخْلِ وَالْهَرَمِ وَأَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ ))

[Allahunmmə inni əuzu bikə minəl-aczi vəl-kəsəli vəl-cubni vəl-buxli vəl-hərami və əuzu bikə min əzabil-qəbri və əuzu bikə min fitnətil-məhyə vəl-məmati.]

“Allahım! Acizlik, tənbəllik, qorxaqlıq, paxıllıq və qocalıqdan sənə sığınıram. Həmçinin qəbir əzabından, ölümün və həyatın fitnəsindən Sənə sığınıram!”[2]

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ جَهْدِ الْبَلاَءِ وَدَرَكِ الشَّقَاءِ وَسُوءِ الْقَضَاءِ وَشَمَاتَةِ الأَعْدَاءِ ))

[Allahummə inni əuzu bikə min cəhdil-bəlai va dərəkiş-şəqai və suil-qadai və şəmatətil-ə`dai.]

[1] əl-Buxari, 6377.
[2] əl-Buxari, 6367.

“Allahım, bəlanın məşəqqətindən, bədbəxt olmaqdan, pis taledən və düşmənlərin bədxahlığından Sənə sığınıram!”[1]

((اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ الْبُخْلِ وَأَعُوذُ بِكَ مِنْ الْجُبْنِ وَأَعُوذُ بِكَ أَنْ أُرَدَّ إِلَى أَرْذَلِ الْعُمُرِ وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الدُّنْيَا وَأَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ ))

[Allahummə inni əuzu bikə minəl-buxli və əuzu bikə minəl-cubni və əuzu bikə ən uraddə ilə ərzəlil-umuri və əuzu bikə min fitnətid-dunya və əuzu bikə min əzabil-qəbr.]

“Allahım, xəsislikdən Sənə sığınıram, qorxaqlıqdan Sənə sığınıram, qocalığın ən düşkün çağına çatmaqdan Sənə sığınıram, dünyanın fitnəsindən Sənə sığınıram, qəbir əzabından Sənə sığınıram!”[2]

(( رَبِّ اغْفِرْ لِي خَطِيئَتِي وَجَهْلِي وَإِسْرَافِي فِي أَمْرِي كُلِّهِ وَمَا أَنْتَ أَعْلَمُ بِهِ مِنِّي اللَّهُمَّ اغْفِرْ لِي هَزْلِي وَ جِدِّي وَ خَطَايَ وَعَمْدِي وَكُلُّ ذَلِكَ عِنْدِي اللَّهُمَّ اغْفِرْ لِي مَا قَدَّمْتُ وَمَا أَخَّرْتُ وَمَا أَسْرَرْتُ وَمَا أَعْلَنْتُ أَنْتَ الْمُقَدِّمُ وَأَنْتَ الْمُؤَخِّرُ وَأَنْتَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ))

[Rabbiğ-firli xətiəti və cəhli və israfi fi əmri kullihi və mə əntə ələmu bihi minni. Allahumməğ-firli həzli və ciddi və xətaya və əmdi və kullu zalikə indi. Allahumməğ-firli mə qaddəmtu və mə əxxərtu və mə əsrərtu və mə ələntu, əntəl-muqəddimu və əntəl-muəxxiru və əntə alə kulli şeyin qədir.]

[1] əl-Buxari, 6347.
[2] əl-Buxari, 6365.

"Ey Rəbbim, mənim günahımı, bilmədiklərimi, bütün işlərimdə israfa yol verməyimi və məndən daha yaxşı bildiyin şeyləri bağışla. Allahım, mənim zarafatla və ya ciddi olaraq, səhvən və ya bilərəkdən etdiyim xətalarımı bağışla! Bunların hamısının məndə olması mümkündür. Allahım, mənim əvvəl etdiyim, sonra edəcəyim, gizlin saxladığım və üzə çıxardığım (pis əməllərimi) bağışla! Əvvələ çəkən də Sənsən, təxirə salan da Sənsən və Sən hər şeyə qadirsən."[1]

(( اللَّهُمَّ إِنِّى ظَلَمْتُ نَفْسى ظُلْمًا كَثيرًا وَلاَ يَغْفرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ، فَاغْفِرْ لِى مَغْفِرَةً مِنْ عِنْدِكَ، وَارْحَمْنِى إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ ))

[Allahummə inni zaləmtu nəfsi zulmən kəsiran və lə yəğfiruz-zunubə illə ənt, fəğfir li məğfirətən min indikə vərhəmni, innəkə əntəl-ğafurur-rəhim.]

"Allahım! Mən özümə çoxlu zülm etmişəm. Günahları yalnız Sən bağışlayırsan. Özün günahımdan keçməklə məni bağışla və mənə rəhm et. Həqiqətən, Sən Bağışlayansan, Rəhmlisən!"[2]

((اللَّهُمَّ لَكَ أَسْلَمْتُ وَبكَ آمَنْتُ وَعَلَيْكَ تَوَكَّلْتُ وَإِلَيْكَ أَنَبْتُ وَبكَ خَاصَمْتُ اللَّهُمَّ إِنِّى أَعُوذُ بعِزَّتكَ لاَ إِلَهَ إِلاَّ أَنْتَ أَنْ تُضِلَّنِى أَنْتَ الْحَىُّ الَّذِى لاَ يَمُوتُ وَالْجِنُّ وَالإِنْسُ يَمُوتُونَ ))

[Allahummə ləkə əsləmtu, və bikəaməntu, və aleykə təvəkkəltu, və ileykə ənəbtu, və bikə xa-

[1] əl-Buxari, 6399.
[2] əl-Buxari, 834.

səmtu. Allahummə inni əuzu bi izzətikə, lə ilahə illə əntə, ən tudilləni, əntəl-həyyulləzi lə yəmut, vəl-cinnu vəl-insu yəmutun.]

"Allahım! Sənə təslim oldum, Sənə iman gətirdim, Sənə təvəkkül etdim, tövbə edib Sənə döndüm, Sənin uğrunda mübarizə apardım. Ey Özündən başqa heç bir məbud olmayan Allahım, azğınlığa düşməkdən Sənin izzətinə sığınıram! Sən Ölməzsən, və əbədi yaşayansan, halbuki cinlər və insanlar ölürlər."[1]

(( اللَّهُمَّ رَبَّ السَّمَوَاتِ السَّبْعِ، وَرَبَّ الْعَرْشِ الْعَظِيمِ، رَبَّنَا وَرَبَّ كُلِّ شَيْءٍ، فَالِقَ الْحَبِّ وَالنَّوَى، وَمُنْزِلَ التَّوْرَاةِ وَالْإِنْجِيلِ، وَالْفُرْقَانِ، أَعُوذُ بِكَ مِنْ شَرِّ كُلِّ شَيْءٍ أَنْتَ آخِذٌ بِنَاصِيَتِهِ. اللَّهُمَّ أَنْتَ الْأَوَّلُ فَلَيْسَ قَبْلَكَ شَيْءٌ، وَأَنْتَ الْآخِرُ فَلَيْسَ بَعْدَكَ شَيْءٌ، وَأَنْتَ الظَّاهِرُ فَلَيْسَ فَوْقَكَ شَيْءٌ، وَأَنْتَ الْبَاطِنُ فَلَيْسَ دُونَكَ شَيْءٌ، اقْضِ عَنَّا الدَّيْنَ وَأَغْنِنَا مِنَ الْفَقْرِ ))

[Allahummə, rabbəs-səmavatis-səb'i və rabbəl-arşil-azim. Rabbənə və rabbə kulli şeyin, faliqal-həbbi vən-nəva, munzilət-təurati vəl-incili vəl-furqan. Əuzu bikə min şərri kulli şeyin əntə axizun binasiyətihi. Allahummə, əntəl-əvvəlu fəleysə qabləkə şeyun, və əntəl-axiru fəleysə bə'dəkə şeyun, və əntəz-zahiru fəleysə fəuqakə şeyun, və əntəl-batinu fəleysə dunəkə şeyun, iqdi annəd-deynə və əğninə minəl-fəqri.]

---

[1] Müslim, 6837.

“Allahım! Yeddi qat səmanın Rəbbi, böyük Ərşin Rəbbi, bizim Rəbbimiz və hər bir şeyin Rəbbi! Toxumu və çəyirdəyi cücərdib çatladan, Tövratı, İncili və Furqanı nazil edən! Kəkilindən tutduğun (idarə etdiyin) hər bir şeyin şərindən Sənə sığınıram. Allahım! Sən Əvvəlsən, Səndən əvvəl heç nə yoxdur. Sən Axırsan, Səndən sonra heç nə yoxdur. Sən Zahirsən, Səndən üstə heç nə yoxdur. Sən Batinsən, Səndən iç üzdə heç nə yoxdur! Borcumuzu ödə, bizi yoxsulluqdan qurtar!”[1]

((اللَّهُمَّ اجْعَلْ فِى قَلْبِى نُورًا وَفِى لِسَانِى نُورًا وَاجْعَلْ فِى سَمْعِى نُورًا وَاجْعَلْ فِى بَصَرِى نُورًا وَاجْعَلْ مِنْ خَلْفِى نُورًا وَمِنْ أَمَامِى نُورًا وَاجْعَلْ مِنْ فَوْقِى نُورًا وَمِنْ تَحْتِى نُورًا. اللَّهُمَّ أَعْطِنِى نُورًا ))

[Allahumməc'al fi qalbi nuran və fi lisəni nuran vəc'al fi səm'i nuran vəc'al fi basari nuran vəc'al min xəlfi nuran və min əmami nuran vəc'al min fovqi nuran və min təhti nuran. Allahummə ə'tıni nuran.]

“Allahım! Qəlbimə və dilimə nur saç! Qulağıma nur saç, gözümə nur saç, arxama və önümə nur saç! Başımın üstündən və ayağımın altından nur saç! Allahım mənə nur bəxş et!”[2]

(( اللَّهُمَّ أَصْلِحْ لِى دِينِىَ الَّذِى هُوَ عِصْمَةُ أَمْرِى وَأَصْلِحْ لِى دُنْيَاىَ الَّتِى فِيهَا مَعَاشِى وَأَصْلِحْ لِى آخِرَتِى الَّتِى فِيهَا مَعَادِى وَاجْعَلِ الْحَيَاةَ زِيَادَةً لِى فِى كُلِّ خَيْرٍ وَاجْعَلِ الْمَوْتَ رَاحَةً لِى مِنْ كُلِّ شَرٍّ ))

---

[1] Müslim, 6827.
[2] Müslim, 1796.

[Allahummə əslih li diniyəl-ləzi huva ismətu əmri və əslih li dunyayəl-ləti fiyhə məaşi və əslih li axirətiyəl-ləti fiyhə məadi vəc'alil-həyatə ziyadətən li fi kulli xeyr, vəc'alil-məutə rahətən li min kulli şərr.]

"Allahım! İsmətli olan dinimi, yaşadığım dünyamı və qayıdacaq axirətimi islah et! Xeyirli işlər üçün ömrümü artır, ölümümü isə şər əməllərdən qurtarmaq üçün rahatlıq vasitəsi et!"[1]

(( اللَّهُمَّ إِنِّى أَسْأَلُكَ الْهُدَى وَالتُّقَى وَالْعَفَافَ وَالْغِنَى ))

[Allahummə inni əs-əlukəl-hudə vət-tuqa vəl-afəfə vəl-ğinə.]

"Allahım, hidayəti, Allah qorxusunu, iffətli və qənaətkar olmağı Səndən diləyirəm."[2]

(( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْعَجْزِ وَالْكَسَلِ وَالْجُبْنِ وَالْبُخْلِ وَالْهَرَمِ وَعَذَابِ الْقَبْرِ اللَّهُمَّ آتِ نَفْسِى تَقْوَاهَا وَزَكِّهَا أَنْتَ خَيْرُ مَنْ زَكَّاهَا أَنْتَ وَلِيُّهَا وَمَوْلاَهَا اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ عِلْمٍ لاَ يَنْفَعُ وَمِنْ قَلْبٍ لاَ يَخْشَعُ وَمِنْ نَفْسٍ لاَ تَشْبَعُ وَمِنْ دَعْوَةٍ لاَ يُسْتَجَابُ لَهَا ))

[Allahummə inni əuzu bikə minəl-aczi vəl-kəsəli vəl-cubni vəl-buxli vəl-hərami və əzabil-qəbri. Allahummə ati nəfsiy təqvahə və zəkkihə əntə xayru mən zəkkahə əntə vəliyyuhə və məulahə. Allahummə inni əuzu bikə min ilmin lə yənfə və min

[1] Muslim, 6841.
[2] Müslim, 6842.

qalbin lə yəxşə və min nəfsin lə təşbəu və min dəvətin lə yustəcəbu ləhə.]

"Allahım, acizlikdən, tənbəllikdən, qorxaqlıqdan, paxıllıqdan, qocalıqdan və qəbir əzabından Sənə sığınıram! Allahım, nəfsimi təqvalı et və onu təmizə çıxart, Sən təmizə çıxaranların ən xeyirlisisən. Sən nəfsimin qəyyumu və hamisisən! Allahım, fayda verməyən elmdən, Səndən qorxmayan qəlbdən, doymayan nəfsdən və qəbul olmayan duadan Sənə sığınıram!"[1]

(( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ زَوَالِ نِعْمَتِكَ وَتَحَوُّلِ عَافِيَتِكَ وَفُجَاءَةِ نِقْمَتِكَ وَجَمِيعِ سَخَطِكَ ))

[Allahummə inni əuzu bikə min zəvali nimətikə və təhəvvuli afiyətikə və fucaəti niqmətikə və cəmiyi səxatikə.]

"Allahım, mənə verdiyin nemətin tükənməsindən, verdiyin uğurun dəyişməsindən, qəfil qisas almağından və bütün qəzəbindən Sənə sığınıram!"[2]

(( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ شَرِّ مَا عَمِلْتُ وَمِنْ شَرِّ مَا لَمْ أَعْمَلْ ))

[Allahummə ini əuzu bikə min şərri mə amiltu və min şərri mə ləm ə'məl.]

"Allahım, etdiyim və etmədiyim əməllərin şərindən Sənə sığınıram!"[1]

---

[1] Muslim, 6844.
[2] Müslim, 6879.

(( اللَّهُمَّ مُصَرِّفَ الْقُلُوبِ صَرِّفْ قُلُوبَنَا عَلَى طَاعَتِكَ ))

[Allahummə musarrifəl-qulubi sarrif qulubənə alə taətikə.]

“Qəlbləri çevirən Allahım! Qəlblərimizi Sənin itaətinə yönəlt.”[2]

(( يَا مُقَلِّبَ الْقُلُوبِ ثَبِّتْ قَلْبِي عَلَى دِينِكَ ))

[Ya muqallibəl-qulub səbbit qalbi alə diynik.]

“Ey qəlbləri döndərən! Qəlbimi dinin üzərində sabit et!”[3]

(( اللَّهُمَّ أَحْسِنْ عَاقِبَتَنَا فِي الأُمُورِ كُلِّهَا وَأَجِرْنَا مِنْ خِزْيِ الدُّنْيَا وَعَذَابِ الآخِرَةِ ))

[Allahummə əhsin aqibətənə fil-umuri kullihə və əcirnə min xizyid-dunyə və əzabil-axirəti.]

“Allahım! Bütün işlərdə aqibətimizi yaxşılaşdır, rüsvayçılıqdan və axirət əzabından bizi qoru!"[4]

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الجُنُونِ وَالجُذَامِ وَالبَرَصِ وَسَيِّئِ الأَسْقَامِ ))

[Allahummə inni əuzu bikə minəl-cununi vəl-cuzami vəl-bərasi və min seyyiil-əsqam.]

“Allahım, divanəlikdən, cüzamdan, albinosluqdan və pis xəstəliklərdən Sənə sığınıram.”[5]

---

[1] Müslim, 6833.
[2] Müslim, 6692.
[3] Səhih ət-Tirmizi, 3/180.
[4] Əhməd, 4/181.
[5] Səhih ən-Nəsai, 3/1116.

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ مُنْكَرَاتِ الأَخْلاقِ وَالأَعْمَالِ وَالأَهْوَاءِ ))

[Allahummə inni əuzu bikə min munkəratil-əxlaqi vəl-ə'mali vəl-əhvai.]

"Allahım! Pis əxlaqdan, yaramaz əməllərdən və fikirlərdən Sənə sığınıram!"[1]

(( اللَّهُمَّ إِنَّكَ عَفُوٌّ كَرِيمٌ تُحِبُّ الْعَفْوَ فَاعْفُ عَنِّي ))

[Allahummə innəkə afuvvun kərimun tuhibbul-afva fə'fu anni.]

"Allahım, Sən Bağışlayansan, Səxavətlisən, bağışlamağı sevirsən, məni bağışla!"[2]

(( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ فِعْلَ الْخَيْرَاتِ وَتَرْكَ الْمُنْكَرَاتِ وَحُبَّ الْمَسَاكِينِ وَأَنْ تَغْفِرَ لِي وَتَرْحَمَنِي وَإِذَا أَرَدْتَ فِتْنَةَ قَوْمٍ فَتَوَفَّنِي غَيْرَ مَفْتُونٍ وَأَسْأَلُكَ حُبَّكَ وَحُبَّ مَنْ يُحِبُّكَ وَحُبَّ عَمَلٍ يُقَرِّبُنِي إِلَى حُبِّكَ ))

[Allahummə inni əs-əlukə filəl-xayrat və tərkəl-munkərati və hubbəl-məsakin və ən təğfira li və tərhəməni və izə əradtə fitnətə qaumin fətəvaffəni ğeyra məftunin və əs-əlukə hubbəkə və hubbə mən yuhibbukə və hubbə aməlin yuqarribuni ilə hubbikə.]

"Allahım, xeyirxahlıq etməyi, pis əməllərdən çəkinməyi, miskinləri sevməyi, məni bağışlamağını, mənə rəhm etməyini və hər hansı qövmə bəla göndərmək istədikdə bəla mənə toxunmazdan əv-

[1] Səhih ət-Tirmizi, 3/184.
[2] Səhih ət-Tirmizi. 3/184.

vəl canımı almağını Səndən istəyirəm. Sənin məhəbbətini və Səni sevənin məhəbbətini qazanmağımı, Sənin məhəbbətinə yaxınlaşdıracaq hər bir əməli sevməyimi Səndən istəyirəm."[1]

(( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ مِنْ الْخَيْرِ كُلِّهِ عَاجِلِهِ وَآجِلِهِ مَا عَلِمْتُ مِنْهُ وَمَا لَمْ أَعْلَمْ
وَأَعُوذُ بِكَ مِنَ الشَّرِّ كُلِّهِ عَاجِلِهِ وَآجِلِهِ مَا عَلِمْتُ مِنْهُ وَمَا لَمْ أَعْلَمْ اللَّهُمَّ إِنِّي
أَسْأَلُكَ مِنْ خَيْرِ مَا سَأَلَكَ عَبْدُكَ وَنَبِيُّكَ وَأَعُوذُ بِكَ مِنْ شَرِّ مَا عَاذَ بِهِ عَبْدُكَ وَنَبِيُّكَ
اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ الْجَنَّةَ وَمَا قَرَّبَ إِلَيْهَا مِنْ قَوْلٍ أَوْ عَمَلٍ وَأَعُوذُ بِكَ مِنَ النَّارِ وَمَا
قَرَّبَ إِلَيْهَا مِنْ قَوْلٍ أَوْ عَمَلٍ وَأَسْأَلُكَ أَنْ تَجْعَلَ كُلَّ قَضَاءٍ قَضَيْتَهُ لِي خَيْرًا ))

[Allahummə inni əs-əlukə minəl-xeyri kullihi acilihi və əcilihi mə alimtu minhu və mə ləm ə'ləm və əuzu bikə minəş-şərri kullihi acilihi və əcilihi mə alimtu minhu və mə ləm ə'ləm. Allahummə inni əs-əlukə min xeyri mə sə-ələkə abdukə və nəbiyyukə və əuzu bikə min şərri mə azə bihi abdukə və nəbiyyukə. Allahummə inni əs-əlukəl-cənnətə və mə qarrəbə ileyhə min qaulin əu əməl və əuzu bikə minən-nari və mə qarrəbə ileyhə min qaulin əu əməl və əs-əlukə ən təc'alə kullə qadain qadaytəhu li xeyran.]

"Allahım, bildiyim və bilmədiyim, tez və gec olan bütün xeyirləri Səndən diləyir, bildiyim və bilmədiyim, tez və gec olan bütün şər əməllərdən də Sənə sığınıram. Allahım, qulun və peyğəmbərinin (Muhəmmədin ﷺ) Səndən istədiklərini Səndən

[1] Əhməd, 5/243.

istəyir və sığındığı şər əməllərdən Sənə sığınıram. Allahım, Cənnəti və ona yaxınlaşdıran hər bir söz və əməli Səndən istəyir, Cəhənnəmdən və ona yaxınlaşdıran hər bir söz və əməldən Sənə sığınıram. Səndən mənim üçün yazdığın hər bir hökmün xeyirli olmasını istəyirəm."[1]

(( اللَّهُمَّ احْفَظْنِي بِالإِسْلامِ قَائماً وَاحْفَظْنِي بالإِسْلامِ قَاعداً وَاحْفَظْنِي بِالإِسْلامِ رَاقداً وَلاَ تُشْمِتْ بي عَدُوًّا وَلاَ حَاسداً اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ مِنْ كُلِّ خَيْرٍ خَزَائِنُهُ بِيَدِكَ وَأَعُوذُ بِكَ مِنْ كُلِّ شَرٍّ خَزَائِنُهُ بِيَدِكَ ))

[Allahummə-hfəzni bil-islami qaimən vəhfəzni bil-islami qaidən vəhfəzni bil-islami raqidən və lə tuşmit bi aduvvan və lə hasidən. Allahummə inni əs-əlukə min kulli xeyrin xazainuhu biyədikə və əuzu bikə min kulli şərrin xazainuhu biyədikə]

"Allahım, məni həm ayaq üstə olduğum zaman, həm oturduğum, həm də uzandığım vəziyyətdə İslam dini ilə mühafizə et. Düşməni və paxılı mənə qarşı sevindirmə. Allahım, xəzinəsi Sənin Əlində olan xeyri Səndən istəyir və xəzinəsi Sənin əlində olan şərdən Sənə sığınıram!"[2]

(( اللَّهُمَّ اغْفِرْ لِي ذَنْبِي وَوَسِّعْ لِي فِي دَارِي وَبَارِكْ لِي فِيمَا رَزَقْتَنِي ))

[Allahummə-ğfir li zənbi və vassi' li fi dəri və bərik li fima rəzaqtəni.]

---

[1] Səhih ibn Macə, 2/327.
[2] əl-Hakim. Səhih hədislər silsiləsi, 1540.

“Allahım, günahımı bağışla, yaşadığım yeri genişlət və mənə verdiyin ruzini bərəkətli et!”[1]

(( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْفَقْرِ وَالْقِلَّةِ وَالذِّلَّةِ وَأَعُوذُ بِكَ مِنْ أَنْ أَظْلِمَ أَوْ أُظْلَمَ ))

[Allahummə inni əuzu bikə minəl-fəqri vəl-qilləti vəz-zilləti və əuzu bikə min ən əzlimə əu uzləmə.]

“Allahım! Yoxsulluqdan, azlıqdan və zillətdən Sənə sığınıram. Habelə zülm etməkdən və ya zülmə məruz qalmaqdan Sənə sığınıram!"[2]

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ يَوْمِ السُّوءِ، وَمِنْ لَيْلَةِ السُّوءِ، وَمِنْ سَاعَةِ السُّوءِ، وَمِنْ صَاحِبِ السُّوءِ، وَمِنْ جَارِ السُّوءِ فِي دَارِ الْمُقَامَةِ ))

[Allahummə inni əuzu bikə min yəumis-sui və min leylətis-sui və min səatis-sui və min sahibis-sui va min cəris-sui fi dəril-muqaməti.]

“Allahım, pis gündən, pis gecədən, pis vaxtdan, pis yoldaşdan və yaşadığım yerdəki pis qonşudan Sənə sığınıram!”[3]

(( اللَّهُمَّ فَقِّهْنِي فِى الدِّينِ ))

[Allahummə fəqqihni fid-din.]

“Allahım! Məni dində bilikli et![4]”[5]

(( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ أَنْ أُشْرِكَ بِكَ وَأَنَا أَعْلَمُ، وَأَسْتَغْفِرُكَ لِمَا لاَ أَعْلَمُ ))

---

[1] Əhməd, 4/63.
[2] Səhih ən-Nəsai, 3/1111.
[3] Səhihul-Cami, 1/411.
[4] Buna Peyğəmbərin ﷺ İbn Abbas üçün رضي الله عنهما etdiyi dua dəlalət edir.
[5] əl-Buxari, 143.

[Allahummə inni əuzu bikə ən uşrikə bikə və ənə ə'ləmu, və əstəğfirukə limə lə ə'ləmu.]

"Allahım! Bilə-bilə Sənə şərik qoşmaqdan Sənə sığınıram və bilmədiklərimə görə də Səndən bağışlanma diləyirəm!"[1]

(( اللَّهُمَّ انْفَعْنِي بِمَا عَلَّمْتَنِي وَعَلِّمْنِي مَا يَنْفَعُنِي وَزِدْنِي عِلْماً ))

[Allahummə-nfə'ni bimə alləmtəni və allimni mə yənfəuni və zidni ilmən.]

"Allahım! Öyrətdiklərinlə mənə fayda ver, fayda verəcək şeyləri mənə öyrət və elmimi artır!"[2]

(( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ عِلْمًا نَافِعًا، وَرِزْقًا طَيِّبًا، وَعَمَلاً مُتَقَبَّلاً ))

[Allahummə, inni əs-əlukə ilmən nafiən və rizqan tayyibən və amələn mutəqabbələn.]

"Allahım! Səndən faydalı elm, təmiz ruzi və məqbul əməl diləyirəm!"[3]

(( اللَّهُمَّ حَاسِبْنِي حِسَابًا يَسِيرًا ))

[Allahummə hasibni hisəbən yəsira.]

"Allahım, mənimlə çəkəcəyin haqq-hesabı yüngül et!"[4]

(( اللَّهُمَّ أَعِنِّي عَلَى ذِكْرِكَ، وَشُكْرِكَ، وَحُسْنِ عِبَادَتِكَ ))

[Allahummə əınni alə zikrikə, və şukrikə, və husni ibadətikə.]

---

[1] Səhih ət-Tərğib və ət-Tərhib, 1/19.
[2] Səhih ibn Macə, 1/47.
[3] Səhih ibn Macə, 1/152.
[4] əl-Hakim, 1/255.

"Allahım! Səni zikr etmək, Sənə şükür etmək və Sənə gözəl tərzdə ibadət etmək üçün mənə yardım et!"[1]

(( اللَّهُمَّ أَحْسَنْتَ خَلْقِي فَأَحْسِنْ خُلُقِي ))

[Allahummə əhsəntə xalqi fə əhsin xuluqi.]

"Allahım! Sən məni gözəl biçimdə yaratdın. Əxlaqımı da gözəl et!"[2]

(( اللَّهُمَّ رَبَّ جِبْرَائِيلَ، وَمِيكَائِيلَ، وَإِسْرَافِيلَ، فَاطِرَ السَّمَوَاتِ وَالْأَرْضِ، عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ، أَنْتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ. اهْدِنِي لِمَا اخْتُلِفَ فِيهِ مِنَ الْحَقِّ بِإِذْنِكَ، إِنَّكَ تَهْدِي مَنْ تَشَاءُ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ ))

[Allahummə Rabbə Cibrailə və Mikailə və İsrafilə fatiras-səməvati vəl-ard, Aliməl-ğaybi vəş-şəhadəti əntə təhkumu bəynə ibadikə fimə kənu fihi yəxtəlifun. İhdini liməxtulifə fihi minəl-həqqi bi iznikə innəkə təhdi mən təşau ilə sıratin mustəqim.]

"Cəbrailin, Mikailin və İsrafilin Rəbbi, göyləri və yeri yaradan, qeybdə və aşkarda olanı Bilən Allahım! İxtilafda olduqları şeylər barəsində bəndələrin arasında Sən hökm verirsən. Baş vermiş ixtilafda məni Öz izninlə haqqa yönəlt! Həqiqətən, Sən istədiyini doğru yola yönəldirsən."[3]

---

[1] əl-Hakim, 1/499.
[2] İrvəul-Ğalil, 1/115.
[3] Muslim, 1/534.

((اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْعَجْزِ وَالْكَسَلِ وَالْجُبْنِ وَالْبُخْلِ وَالْهَرَمِ وَالْقَسْوَةِ وَالْغَفْلَةِ وَالْعَيْلَةِ وَالذِّلَّةِ وَالْمَسْكَنَةِ وَ أَعُوذُ بِكَ مِنَ الْفَقْرِ وَالْكُفْرِ وَالْفُسُوقِ وَالشِّقَاقِ وَالنِّفَاقِ وَالسُّمْعَةِ وَالرِّيَاءِ وَ أَعُوذُ بِكَ مِنَ الصَّمَمِ وَالْبَكَمِ وَالْجُنُونِ وَالْجُذَامِ وَالْبَرَصِ وَ سَيِّءِ الأَسْقَامِ ))

[Allahummə inni əuzu bikə minəl-aczi vəl-kəsəli vəl-cubni vəl-buxli vəl-hərəmi vəl-qəsvəti vəl-ğəfləti vəl-ayləti vəz-zilləti vəl-məskənəti və əuzu bikə minəl-fəqri vəl-kufri vəl-fusuqi vəş-şiqaqi vən-nifaqi vəs-sum-əti vər-riyai və əuzu bikə minəs-saməmi vəl-bəkəmi vəl-cununi vəl-cuzəmi vəl-bərasi və seyyi-il-əsqami.]

"Allahım, acizlikdən, tənbəllikdən, qorxaqlıqdan, paxıllıqdan, qocalıqdan, sərt olmaqdan, qəflətdən, ehtiyacdan, rüsvayçılıqdan, miskinlikdən, kasıbçılıqdan, kafirlikdən, asilikdən, ixtilafdan, nifaqdan, lovğalıqdan, riyakarlıqdan, karlıqdan, lallıqdan, divanəlikdən, cüzamdan, albinosluqdan və pis xəstəliklərdən Sənə sığınıram!"[1]

(( اللَّهُمَّ اجْعَلْ أَوْسَعَ رِزْقِكَ عَلَيَّ عِنْدَ كِبَرِ سِنِّي وَ انْقِطَاعِ عُمْرِي ))

[Allahumməc'al əusəa rızqıkə aleyyə ində kibəri sinni vənqitai umri.]

"Allahım! Ən bol ruzini mənə qocaldıqda, ömrümün sonunda ver."[2]

---

[1] Səhih əl-Cami, 1/407.
[2] Səhih hədislər silsiləsi, 1539.

## Qəbul olan dualara misallar

“Nuh Bizə yalvarıb yaxardı. Biz *çağırışa* necə də gözəl cavab verənik! Biz onu və ailəsini böyük sıxıntıdan qurtardıq. Təkcə onun nəslini qoruyub saxladıq.”[1]

“İbrahim və İsmail dedilər: Ey Rəbbimiz! Onların içərisindən özlərinə elə bir elçi göndər ki, Sənin ayələrini onlara oxusun, Kitabı və hikməti onlara öyrətsin və onları *günahlardan* təmizləsin! Həqiqətən, Sən Qüdrətlisən, Müdriksən!”[2]

Allah İbrahim peyğəmbərin ﷷ duasını qəbul edib Muhəmmədi ﷺ peyğəmbər və elçi olaraq bütün bəşəriyyətə göndərdi. Buna dəlil: “Savadsızlara özlərindən elçi göndərən Odur. *Elçi* onlara *Allahın* ayələrini oxuyar, onları *pis əməllərdən* təmizləyər, onlara Kitabı və Hikməti öyrədər. Halbuki onlar əvvəllər açıq-aydın azğınlıq içində idilər.”[3]

“O zaman Musa öz xalqı üçün su istədikdə, Biz: “Əsanla daşa vur!”– dedik. *Daşdan* on iki çeşmə qaynayıb çıxdı. Hər qəbilə su içəcəyi yeri tanıdı.”[4]

“Məryəm oğlu İsa dedi: “Ey Allahım! Ey bizim Rəbbimiz! Bizə göydən bir süfrə endir ki, bizim həm birincimiz, həm də axırıncımız üçün bir bay-

---

[1] əs-Saffat, 75-77.
[2] əl-Bəqərə, 129.
[3] əl-Cumuə, 2.
[4] əl-Bəqərə, 60.

ram və Səndən bir möcüzə olsun. Bizə ruzi ver, Sən ruzi verənlərin ən yaxşısısan!" Allah dedi: "Mən onu sizə endirəcəyəm. Amma *bundan* sonra aranızdan kafir olanlara aləmlərdən heç kəsə vermədiyim bir əzabı verəcəyəm."[1]

Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ cümə günü xütbə verərkən bir nəfər minbərin qarşısındakı qapıdan içəri daxil oldu və Peyğəmbərlə ﷺ üzbəüz durub dedi: "Ey Allahın elçisi, mal-qara məhv oldu, yollar bağlandı, Allaha dua et ki, bizə yağmur endirsin." Peyğəmbər ﷺ əllərini (göyə) qaldırıb dedi: "Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir!" Vallahi, (həmin an) biz göydə nə bir bulud, nə bir bulud parçası, nə də başqa bir şey görürdük. Bizimlə Səl dağının arasında nə bir ev, nə də bir koma vardı. (Bu vaxt) dağın arxasından qalxanabənzər bir bulud göründü. O gəlib göyün ortasına çatdıqdan sonra (ətrafa) yayıldı və yağış yağmağa başladı. Vallahi, altı gün biz günəşi görmədik. Növbəti cümə günü Peyğəmbər ﷺ xütbə verərkən (yenə) bir nəfər həmin qapıdan içəri daxil oldu və Peyğəmbərlə ﷺ üzbəüz durub dedi: "Ey Allahın elçisi, mallar zay oldu, yollar bağlandı. Allaha dua et ki, yağışı dayandırsın. Peyğəmbər ﷺ əllərini (göyə) qaldırıb dedi: "Allahım! (Yağışı) üstümüzə deyil,

[1] əl-Maidə, 114-115.

ətrafımıza yağdır. Allahım, təpələrə, dağlara, bağlara, yamaclara, vadilərə və ağac bitən yerlərə (yağdır)! Yağış kəsdi və biz günəşli havada (gəzişmək üçün) bayıra çıxdıq.[1]

Əbu Hüreyrə ﵁ belə rəvayət edir ki, “Mən müşrik olan anamı İslama dəvət edirdim. Bir gün yenə onu dəvət etdikdə Peyğəmbər ﷺ haqqında nalayiq sözlər dedi. Mən ağlaya-ağlaya Peyğəmbərin ﷺ yanına gəlib dedim: "Ey Allahın elçisi! Mən anamı İslama dəvət edirdim. O, bunu inkar edib sənin haqqında nalayiq sözlər dedi. Allaha dua et ki, Əbu Hüreyrənin anasına hidayət versin!” Peyğəmbər ﷺ dedi: “Allahım, Əbu Hüreyrənin anasına hidayət ver!” Mən Peyğəmbərin ﷺ duasından sonra sevincək evə qayıtdım. Qapıya çatdıqda anamın ayaq səslərini eşitdim. O, mənə yerimdə durmağı əmr etdi. Sonra çimib (qüsl edib), paltarını geyib qapını açıb mənə dedi: “Ey Əbu Hüreyrə! Şəhadət verirəm ki, Allahdan başqa (ibadətə layiq olan) ilah yoxdur və Muhəmməd də onun qulu və elçisidir!” Mən sevincimdən ağlaya-ağlaya Peyğəmbərin ﷺ yanına gəlib ona dedim: “Ey Allahın elçisi! Muştuluğumu ver, Allah sənin duanı qəbul etdi və Əbu Hüreyrənin anasına hidayət verdi...”[2]

---

[1] əl-Buxari, 1013.

[2] Müslim, 6346.